**Azərbaycan Tarixi Şəcərə Cəmiyyətinin Xəbərləri. Onuncu buraxılış.**
Bakı: "Nurlar" Nəşriyyat-Poliqrafiya Mərkəzi, 2018. 284 səh.

Bu sayından yeniləşmiş redaksiya heyəti ilə çıxan "Azərbaycan Tarixi Şəcərə Cəmiyyətinin Xəbərləri" toplusu bu cür elmi nəşrlərə verilən beynəlxalq tələblərə uyğun şəkildə tərtib edilib.

Toplunun bu sayında oxuculara Azərbaycanın müxtəlif qədim və nüfuzlu soylarının tarixi, görkəmli şəxsiyyətlərinin tərcümeyi-halları, azərbaycanlıların doğma diyardan uzaqlardakı fəaliyyəti haqqında məqalələr, Azərbaycan müəllifi Ə.Dərbəndlinin tarixi əsəri, soydaşlarımızın qərib məzarları haqqında yazılar və b. təqdim edilir.

ISBN: 978-9952-508-77-2

# AZƏRBAYCAN
# TARİXİ ŞƏCƏRƏ CƏMİYYƏTİNİN
# XƏBƏRLƏRİ

ONUNCU BURAXILIŞ

---

# PROCEEDINGS of the AZERBAIJAN
# HISTORIC GENEALOGICAL SOCIETY

ISSUE 10

---

# ИЗВЕСТИЯ АЗЕРБАЙДЖАНСКОГО
# ИСТОРИКО-РОДОСЛОВНОГО ОБЩЕСТВА

ВЫПУСК 10

---

## İÇİNDƏKİLƏR / SUMMARY / СОДЕРЖАНИЕ

**E.R. NƏCİYEV**

# 555 İLLİK BİR MƏZARIN TARİXÇƏSİ

***Açar sözlər**: Səfəvilər, Ərdəbil, Şeyx Cüneyd, Həzrə, mütəvəlli.*

XVI əsrdə yaranmış Səfəvilər dövlətinin özəyini təşkil edən Azərbaycan bu dövlətin yaradıcılarının həm sağlığında, həm də ölümündən sonra yurd yeri olmuşdur. Bu gün Cənubi Azərbaycanda yerləşən Şeyx Səfi kompleksi və Şah İsmayıl məqbərəsi Ərdəbilin simvolu hesab olunursa, Şimali Azərbaycanın tarixi Şirvan ərazisində yerləşən Şeyx Cüneyd (1447–1460) və Şeyx Heydər (1460–1488) türbələri də eyni statusu daşıyacaq əhəmiyyətə malikdir. Lakin təəssüflər olsun bu abidələrə bəslənən laqeyd münasibət sonuncunun uçulub dağılmasına, Şeyx Cüneyd türbəsinin isə baxımsızlıqdan əziyyət çəkməsinə səbəb olmuşdur. Məqaləmizin mövzusu da məhz bu türbələrdən biri olan Şeyx Cüneyd abidəsi, o cümlədən də şeyxin şəxsiyyəti və fəaliyyəti barədədir.



Azərbaycan tarixinin parlaq səhifələrindən biri olan Səfəvi dövləti öz başlanğıcını XIV əsrdə Ərdəbildə ortaya çıxan Ərdəbil Təkkəsindən götürmüşdür. Os-

manlı mənbələrində bu ocağa “Ərdəbiliyyə”, onun müridlərinə isə “Ərdəbil sufiləri” deyilirdi [*5*, səh. 22]. Bu ocağın banisi Şeyx Səfiəddin İshaq Ərdəbili (həyatı: 1252–1334; şeyxliyi: 1301–1334) [*9*, səh. 130] və onun nəslindən bəhs edərkən akademik V.V.Bartold göstərirdi ki, “bu Ərdəbil şeyxləri, şübhəsiz, fars deyil, türk mənşəlidirlər” [*18*, səh. 748]. İ.P.Petruşevski də eyni fikri söyləmişdir: “İlk Səfəvi şeyxləri Ərdəbildə yaşamışlar, onların doğma dili Azərbaycan dili olmuşdur” [*20*, səh. 362]. Şeyx Cüneydə qədər Şeyx Səfi, Şeyx Sədrəddin (şeyxliyi: 1334–1392), Xoca Əli (şeyxliyi: 1392–1429) və Şeyx İbrahimdən (şeyxliyi: 1429–1447) ibarət ilk dörd şeyx zamanında Ərdəbil şeyxlərinin siyasətlə birbaşa bağlılıqları olmamış, təkkə dini-təsəvvüf mərkəzi olaraq fəaliyyət göstərmişdir [*7*, səh. 83]. Ərdəbil dərgahında Şeyx İbrahimin ölümündən sonra təriqətə girmiş olan siyasi təmayüllər, atadan oğula keçən şeyxlik ənənəsini pozmuşdur. Şeyx İbrahimdən sonra ilk dəfə bu məqam uğrunda mübarizə baş verir. Onun altı oğlundan biri olan Cüneydin şeyxlik məqamına oturmalı olduğuna baxmayaraq, şeyxlik uğrunda mübarizədə qalib gələn İbrahimin qardaşı Şeyx Cəfər Ərdəbil dərgahının rəhbəri olur. Bu səbəbdən də Səfiəddin ailəsi daxilində şeyxlik mübarizəsi siyasi bir xarakter almış olur [*3*, səh. 387].



Bəs Şeyx Cüneyd kim idi? Onun fəaliyyəti hansı səbəbdən bir çoxlarını, o cümlədən də Baharlı hökmdarı Cahanşahı narahat edirdi? Səfəvilər və Osmanlılar

dövrünün müxtəlif qaynaqlarının Şeyx Cüneydlə bağlı verdikləri məlumatlara nəzər salmaqla onun şəxsiyyətini daha dolğun dəyərləndirmək və başa düşmək müm-kündür. Bayandurlu tarixçisi Fəzlullah ibn Ruzbixan Xunci (ö. 927/1521) yazır ki, "şeyxlik sırası Şeyx Cüneydə gəldikdə, o atalarının həyat tərzini dəyişdirdi: xəyalındakı siyasi ehtiras yenidən dirçəldi. Hər an o, hər hansı ölkəni, yaxud vilayəti işğal etməyə çalışdı" [*21*, səh. 78]. Şah I Təhmasib (1524–1576) zamanında yaşamış Səfəvi tarixçisi Qazi Əhməd Qəffari (ö. 975/1568) isə Səfəvi şeyxlərindən bəhs etdiyi əsərində Şeyx Cüneyddən danışarkən, onun təkkənin simasını dəyişdirdiyini, vilayət ilə məşğul olan bir təkkədə səltənət işlərinə meyllənmə olduğunu yazırdı [*7*, səh. 88]. Osmanlı tarixçisi Gelibolulu Əli (ö. 1008/1600), "Hükümet-i Şahanı Erdebili" başlığı ilə bəhs etdiyi Səfəvi ailəsindən "ilkin olaraq ləşkər cəm edib sevdayi təməllük (dövlət sevdası) edən Şeyx Cüneyddir" deyir. Münəccimbaşı (ö. 1114/1702), "Sultan Şeyx Cüneyd xəlifə oldu, əba və əcdadı libasını tərk edib səltənət tərzinə daxil oldu". Ərəb tarixçisi Əhməd əl-Kirmani (ö. 1019/1610), bu ailədən ilk dəfə ortaya çıxan və əsgər toplayan nəfərin Şeyx Cüneyd olduğunu məlumat verirdi [*7*, səh. 88]. Məhz bu cür baxışlarına və fəaliyyətinə görə, onun əmisi Şeyx Cəfərin şeyx olmasında maraqlı olan Baharlı hökmdarı Müzəffərəddin Cahanşah Həqiqi (1436–1467) hətta qızını onun oğlu Qasimə ərə verməklə Ərdəbil şeyxlərinin nüfuzunu zəiflətməyə çalışırdı. Digər tərəfdən Cahanşah 20 yaşında ikən Səfəviyyə sufi təriqətinin mürşidi olmuş Şeyx Cüneydin şiəlik şüarları altında siyasi iddialarla çıxış etməsindən ehtiyat edirdi. Əslində Şeyx Cüneydin Ərdəbili tərk etməsinə səbəb olan Cahanşahın Ərdəbil dərgahının işlərinə qarışmasını və Şeyx Cüneydi yurdunu tərk etməyə məcbur etməsini təbii olaraq qarşılamaq lazımdır. Çünki Şeyx Cüneydə qədər Ərdəbil şeyxlərindən heç biri siyasi hakimiyyət qurmağa cəhd etməmişdi. Məhz onun pirliyi zamanında Ərdəbil ocağı səlatin qılığını, yəni sultan-lıq libasını mənimsəyərək siyasi hakimiyyət qurma hazırlığına qədəm qoymuşdu [*8*, səh. 23]. Şeyx Cüneydin bu cür fəaliyyətinə qarşı olmasına baxmayaraq Cahanşah onu öldürməklə aradan qaldırmaqdan çəkinir və Şeyx Cəfərə məktub yazaraq onu dövlətindən uzaqlaşdırmaqla yetinməyə çalışırdı [*12*, səh. 131]. 1449-cu ildə də bu istə-yinə nail olur. Təzyiqlərə dözə bilməyən Şeyx Cüneyd Anadoluya pənah aparır. 1449–1456-cı illərdə Cüneyd Anadolunu gəzib-dolaşdı, orada müxtəlif hərbi-siyasi hadisələrin iştirakçısına çevrildi [*9*, səh. 131]. Gənc və enerjili şeyxin on il boyunca Anadoluda apardığı təbliğat təsirsiz ötüşməmiş, bu regiondakı müxtəlif türk tayfa-larının Səfəvi nəslinə bağlılığı daha da qüvvətlənmişdi. F.Sümerin qeyd etdiyi kimi, "Anadolu türklərindən mühüm bir qismini Səfəvi təriqətinə bağlayan Cüneyd olmuşdur" [*14*, səh. 36]. O, əvvəlcə Osmanlı torpaqlarına gəlir və bir Quran, bir səcca-də, bir də təsbeh hədiyyə göndərməklə [*12*, səh. 131] dərviş heyətini sultan II Murada (1421–1444 – I

dəfə; 1446–1451 – II dəfə) göndərərək, ondan məskən qurub dua və ibadətlə məşğul olmaq üçün Qurd Belini adlanan yerdə ona bir təkyə verilməsini istəyir. Sultan II Murad bunu vəziri Xəlil paşaya danışdıqdan sonra, Xəlil paşa da "Bir məqama yeddi dərviş sığar, lakin dünya qitəsinə iki hökmdar sığmaz" məlum atalar sözünü sultana xatırlatdı. Sultan II Muradda vəzirinin bu sözünə əməl edərək gələn dərvişlərin hər birinə 100, bəzi müəlliflərə görə isə 1000 axça [*16*, səh. 57] xərclik, Şeyx Cüneydə də 200 florin (200 duka qızıl, yəni 9 min axça) göndərməklə bu təklifi rədd etmişdi [*2*, səh. 36]. Rədd cavabı aldıqdan sonra 1450-ci ildə Qaraman bəyliyinin paytaxtı olan Konyaya getdi. Konyada hələ XIII əsrdə Şeyx Sədrəddin Konevi tərəfindən qurulmuş təkyədə qalan Şeyx Cüneyd burada Mevlana Xeyrəddindən dərs alır, Şeyx Muhyiddin Ərəbinin kitabları ilə tanış olur [*16*, səh. 57]. Bu təkyənin başçısı olan Şeyx Əbdülləttiflə dini-ideoloji müstəvidə mübahisə etmiş və dü-şüncələrinə görə təzyiqə məruz qaldığına görə oranı tərk etməli olmuşdur. Daha sonra Toros dağlarındakı varsaq türkmənlərinə sığınan Səfəvi şeyxinin təbliğat aparmasından narahat olmuş Qaraman hökmdarı İbrahim bəy onu həbs etmək fikrinə düşdü. Cüneyd tərəfdarları ilə birlikdə Məmlük dövlətinin tərkibindəki İsgən-dərun körfəzi sahillərinə qaçdı və oradakı Cəbəl-Arus dağında köhnə bir qalaya sığındı. Burada bir müddət qalan şeyxin başına xeyli müridlər toplaşdı. Məmlük sultanı Zahir Seyfəddin Çakmak (1438–1453) onun həbs edilməsi haqqında Hələb hakiminə təlimat verdi. 1453-cü ildə Hələb hakiminin göndərdiyi qoşunla toqquş-mada məğlub olan Cüneyd Qara dəniz sahilindəki Canikə qaçdı [*9*, səh. 131]. Orada ətrafına müridlərindən ibarət silahlı dəstələr cəmləşdirən şeyx 1456-cı ildə yunan-ların, əlindəki Trabzon qalasına həmlə etdi. İlkin uğurlarına baxmayaraq, Osmanlı dövlətinin etirazı və üzərinə qoşun göndərməsi səbəbindən Trabzondan əl çəkməli oldu [*16*, səh. 58]. Ordan Həsən-Keyfə getdi və daha sonra, 1456-cı ilin axırlarında o zamanlar hələ Diyarbəkr hakimi olan Ağqoyunlu Həsənə padşaha sığındı. Bu barədə Namiq Musalı dövrün mənbələrinə istinadən yazır ki, "Diyarbəkir mülkündə Həsən bəy Ağqoyunlu türkman camaatının hakimi idi… Eşitdi ki, Mirzə Cahanşahın vahiməsi üzündən öz vətənindən ayrılan [Cüneyd] onun yanına, Diyarbəkrə gəlməkdədir. Buyurdu ki, el ağsaqqalları atlara minib, onu 2–3 mənzil məsafədən qar-şılasınlar və özü də şəxsən qohumları ilə birlikdə atlara süvar olaraq, [Cüneydi] qarşılamaq üçün 1 mənzil yol qət etdi. O, Sultan Cüneydi uzaqdan gördükdə pi-yada oldu, bir-birilərinə yaxınlaşdılar, qucaqlaşıb görüşdülər. [Həsən bəy] onun müridlərinə xeyli izzət göstərdi və Sultan Cüneyd üç il onun yanında mehman oldu" [*10*, səh. 100]. Bu müddətdə bayandurlu Həsən padşah Cahanşaha qarşı mübarizə-də Səfəvilərin dəstəyini almaqdan ötrü Şeyx Cüneydlə müttəfiqlik münasibətləri yaratdı və öz bacısı Xədicə bəyimi şeyxə ərə verdi [*6*, səh. 14–22, 26–27]. Bu nikahın sorağı Kiçik Asiyanın və Suriyanın ən uzaq guşələrinə yayıldı

və "əvvəlki şeyxlərin" xəlifələri Cüneydin görüşünə gəldilər [*4*, səh. 36]. Həsən padşahın Diyarbəkrdəki sarayında üç il qalan Cüneyd "vətən sevgisi imandandır" deyərək Azərbaycana qayıtmağı qərara aldı və Diyarbəkirdən Ərdəbilə doğru yola çıxdı. Cüneydin gəlişi barədə Cahanşaha xəbər verən casuslar həyəcan təbilini çalırdılar: "Sultan Cüneyd Diyarəbəkrə getmiş, Ağqoyunlu Həsən bəy Türkmanın bacısı ilə evlənmiş və onunla qohum olduqdan sonra qüvvəsi daha da artmışdır. İndi isə köçünü yığıb, Ərdəbilə doğru gəlməkdədir" [*10*, səh. 101]. Cahanşah Cüneydlə savaşmaq üçün ordu toplanmasını əmr etdi. Bu xəbəri alan Cüneyd Ərdəbildə dura bilməyəcəyini anlayıb, Şirvanşahlar dövlətinə son qoymaq və Şirvanı ələ keçirmək məqsədi ilə yürüşə çıxmağı qərara aldı. Lakin, o, əsl niyyətini açıq elan etmir, Çərkəz nəsranilərinə (xristianlara – *E.N.*) qarşı cihad etmək istəyində olduğu üçün səfərə çıxdığını bəyan edirdi. Cüneyd "sufilərdən və müridlərdən" ibarət 20 minlik qoşunu ilə birlikdə Araz çayını keçib, Qarabağa getdi və oradan da Kür çayını adlayıb, Şirvana qədəm qoydu. Cüneydin əmisi Şeyx Cəfər Şirvanşaha məktub yazaraq, qardaşı oğlunun əsl məqsədlərini açıqladı və onun dəf edilməsinin vacib olduğunu bildirdi. Cüneydin "Çərkəz ölkəsinə getmək bəhanəsi ilə Şirvanı tutmağa gəldiyini" öyrənən Şirvanşah Sultan Xəlil (1417–1465) 20 minlik mükəmməl bir ordu hazır etdi. Onun müraciəti əsasında Təbərsəran hakimi Əbül Məsum xan və Cahanşah da onun köməyinə hərəyə 5 minlik qoşun göndərdilər. Müttəfiqlərin 30 minlik birləşmiş ordusu ilə Cüneydin "sufiləri" üz-üzə gəldilər. Gərgin keçən



döyüş nəticəsində Səfəvi qoşunu ağır məğlubiyyətə uğradı, Cüneyd isə qətlə yetirildi [*10*, səh. 101–102]. Nihat Çetinkaya Qızılbaş türklər adlı əsərində Şeyxin döyüş zamanı Qarasu adlı ərazidə sıxışdırıldığını və buradakı döyüş zamanı öldürüldükdən sonra bir neçə sadiq müridi tərəfindən cəsədinin Kurbal və ya Kumal deyilən bir yerdə dəfn olunduğunu yazırdı [*3*, səh. 395]. Lakin bu məntəqələrin hazırda hansı ərazilər olması barədə hər hansı bir məlumat yoxdur. Bu adları verərkən belə Nihat Çetinkayanın istinad etdiyi İslam Ensikopediyasında da bu məlumatın hardan götürülməsinə dair bir istinad yoxdur [*15*, səh. 123]. Şeyx Cüneydin Şirvan yürüşü zamanı məğlub olaraq qətlə yetirildiyi və

dəfn olunduğu ərazi barədə Abbasqulu ağa Bakıxanovun əsərində verdiyi məlumat daha dolğundur. Belə ki, Bakıxanov Gülüstani-İrəm əsərində yazır ki, "Şeyx Cüneyd də öz müridlərinin sayını artırıb səltənət iddiasına başladı. Çərkəzlərə qarşı müharibə etmək fikrilə 10000 nəfər toplayıb Şirvan tərəfinə hərəkət etdi… o, Şirvanı almağa getmişdi. Necə olursa-olsun, şirvanşah Sultan Xəlil Təbərsəran əhalisinin təhrikilə, onun çərkəz tərəfinə getməsinə mane oldu və qoşun toplayıb döyüşə çıxdı. Samur çayının sol sahilində Qıpçaq kəndi yaxınlığında baş verən güclü döyüşdə Şeyx Cüneyd öldürüldü. Onun Səfəvilərdən olan bəzi müridləri cəsədini müharibə meydanından çıxarıb Quba əyalətinin hazırda Həzrə adlanan Gülxan kəndində kəndində torpağa tapşırdılar. Onun nəvəsi I Təhmasib 100 il son-ra (əslində 84 il sonra – *E.N.*) məzarı üzərində ali bir türbə və məscid tikdirmişdir. Asarı indi də mövcud olub, yerli əhalinin ziyarətgahıdır" [*17*, səh. 92–93].




Həqiqətən də hazırda Qusarın Həzrə adlanan kəndində Şeyx Cüneyd türbəsi yerləşir. Şeyxin burada dəfn olunmasının kəndin adına da təsir göstərməsini mənbələrdən oxuyuruq. Məsələn, Abbasqulu ağa Bakıxanov yazır ki, "Həzrət sözündən dəyişmiş olan Həzrə kəndinin əhalisini, həmin padişah, İrandan Quba vilayətinə köçürüb, öz babası Şeyx Cüneydin məzarı ətrafında yerləşdirmişdir. Bunlar indi, sünni məzhəbində olsalar da, bir məhəllələri hələ də, "Şiələr məhəlləsi" adı ilə məşhurdur" [*17*, səh. 22]. Hətta Bakıxanov XIX əsrdə türbəyə təyin edilən mütəvəllinin adını da əsərində qeyd edir. O yazır ki, "Hicri 1225-ci (=1810) ildə, il yarımdan ar-tıq Təbərsəranda qalmış Şeyx Əli xan, əcdadı Səfəvilər dovründən Şeyx Cüneyd türbəsinin mütəvəllisi olan həzrəli Xan Butay bəy Hacı Şərif bəy oğlunun təhrikilə gəlib Quba əhalisinin çoxunu özünə müttəfiq

etdi” [*17*, səh. 192]. Burada haqqında bəhs edilən türbə mütəvəllisi Xan Butay bəy Hacı Şərif bəy oğlunun şəxsiyyəti ilə bağlı geniş məlumat verilməsə də ən azından onun bu vəzifəni icra etməsi ilə həzrəli olan əcdadlarının işini davam etdirməsi məlum olur. Onun icra etdiyi mütəvəllilik vəzifəsi şahlara aid olan vəqfələrə ovqafe təfvizi və ayrı-ayrı şəxslərə aid olan vəqflərə isə ovqafe şəri deyilirdi. Şəriət ehkamı əsasında tərtib edilmiş vəqfnamə adlı müvafiq sənəd əsasında müəyyən vəqf əmlakını idarə edən şəxs mütəvəlli ad-lanırdı. Mütəvəlli vəqf əmlakının gəlirlərinin hər hansı istiqamətdə sərf olunmasına aid sərəncamlar vermək səlahiyyətlərinə malik idi [*1*, səh. 189]. Təəssüf ki əlimizdə türbənin digər mütəvəllilərinin adları barədə məlumat yoxdur. Bu səbəbdən də nə vaxta qədər abidəyə mütəvəllilər təyin edilməsi barədə fikir söyləyə bilmərik. Sadəcə qeyd edə bilərik ki, hazırda abidənin baxıcısı kənd sakini Məhbubə Kərimovadır.

Bişmiş kərpicdən inşa edilən türbə binası daxildən və xaricdən düzbucaqlı plana malikdir. Şeyx Cüneydin məzarı üzərindəki sənduqə bərk ağacdan nəfis işlənmiş şəbəkəli çərçivə içərisinə alınmış, üzərində minbər qoyulmuşdur. Görünür, bu türbədən bir zamanlar məscid kimi istifadə edilmişdir. XVI–XVII yüzilliklərdən dövrümüzə gəlib çatmış şəbəkəçilik sənətinin iki gözəl nümunəsindən



biri olan bu sənduqə çox böyük deyildir. Onun uzunluğu 2,12 m, eni 1,20 m, hündürlüyü 1,25 m-dir. Böyük çərçivələrdə ardıcıl taxılmış 52 ədəd kiçik, dördkünc

şəbəkə kompozisiyaları bu sənduqənin əsas bəzəyini təşkil edir. Şəbəkələrin ornament motivləri dördbucaqlı ulduz və çoxbucaqlı həndəsi xonçalardan ibarətdir. Şeyx Cüneyd sənduqəsinin şəbəkə bəzəklərinin əsas xüsusiyyətlərindən biri də onun birüzlü olmasıdır [*13*, səh. 162]. Şeyx Cüneyd türbəsi böyük aşırımlı günbəzlə örtülü imiş. Sonralar ona bitişik məscid tikilməsi və damın dəyişdirilməsi nəticəsində türbə öz əvvəlki görkəmini itirmişdir. Türbənin içərisi əvvəlki kimi qaldığı üçün daha maraqlıdır və burada hər şeydən əvvəl, günbəzə keçid təşkil edən stalaktitlərin məharətlə həlli diqqəti cəlb edir. Türbənin daxili divarları 2 m hündürlüyə qədər bənövşəyi və firuzəyi kaşı ilə örtülmüşdür [*13*, səh. 174]. Türbənin həm şərq, həm də qərb qapısı üzərində yazılı kitabə olub. Hazırda isə qərb qapısı üzərindəki yeddi sətirdən ibarət ərəb dilində nəsx xətti ilə həkk olunmuş kitabə türbə üzərində qalır. Həmin kita-bədə aşağıdakı sətirlər həkk olunmuşdur:

"Bu mübarək və şərəfli imarətin, yüksək sultan, kəramətli və ədalətli xaqan, fars və ərəb hökmdarlarının ağası – Allah onun kölgəsini yelərdən əskik eləməsin – qurunun və suyun rəhmanı, dini, dünyanı, xilafəti və səltənəti əzizləyən, Mustafaya (Məhəmməd peyğəmbərə) mənsub olan şəriət qaydalarını yayan, Murtəzəvi təriqətinin (yəni şiəliyin) əsasını qoyan, minnət və ehsan edən, Allah tərəfindən müvəffəqiyyətlənmiş, ehtiyacsız Allaha təvəkkül eləyən, Sultan oğlu Sultan Əbülmüzəffər şah Təhmasib əl-Hüseyni Bahadurxanın – Allah onun hökmranlığını və sultanlığını daima etsin və hər iki dünyanı onun yaxşı işləri və ehsanı ilə feyzləndirsin, öz qəlbini, biliyini Allaha və bəşər aləminə həsr etməyi ilə həzrətlərindən seçilsin (məxsus qılsın) – hökmranlığı zamanında səadət və əzizlik sahiblərinin ən fəxrlisi, vahid Allahın rəhmətinə qovuşmuş Xacə Fəxrəddin Əhməd Fərəhaninin – yüksək Allah onun şükrlərini, səylərini və yaxşı işlərini qəbul etsin – oğlu, qəbilələrin pənahgahı olan böyük vəzir həzrətləri, Allah rəhmətinə getmiş Ziyaəddin Nizamülmülk oğlu ən yüksək vəzirlərin vəziri, hökmdar və valilərin bəyənilmişi, xalqın bü-tün üzvlərinin tədbirçisi, xalqın yaxşı işlərinə zəmin olan əmmamə sahiblərinin xidmətkarı, kəramət sahiblərinin itaət olunmuşu, yaxşı işlər binalarının banisi, eh-san və səy edənlərin çalışqanı, vahid Allahın mehribanlığı ilə seçilmiş, əzizlik və vəzirlik fələkinin günəşi Ağa Məhəmməd, kəramət sahiblərinin sultanı, yetişmiş və bəyənilmişlərin rəhbəri, ariflərin (bilikli adamların) rəisi, düz yolla gedənlərin yol göstərəni, təriqət məsləkində vahid yol seçmiş, həqiqət məmləkətlərinin sahibi, öz razılıqları ilə eyni məslək istəyənlərin müridi, kainatın sahibi, öz fazilliyi (biliyi) ilə dövlətli olan Sutan Şeyx Cüneyd Səfəvinin – Allah onun qəbrini işıqlandırsın və şəhid olduğu yeri haqq eləsin – qəbri üzərində doqquz yüz əlli birinci ilin axırında tikilməsinə müvəffəq olmuşdur". Hicri 951-ci il 1544/1545-ci miladi ilinə müvafiqdir. Kitabədən göründüyü kimi abidəni, məscid-türbəni hicri 951-ci il (1544–1545) ilin

axırlarında Şah I Təhmasibin hökmranlığı dövründə onun vəziri Xacə Fəxrəddin Əhməd Fərəhani oğlu Xacə Ziyaəddin Nizamülmülkün oğlu Ağa Məhəmməd tikdirmişdir [*11*, səh. 54]. B.Dornun fondunda onun dövründə türbə kom-pleksində mövcud olmuş digər kitabələrin mətnləri saxlanılır. Bu kitabələrdə aşağıdakı mətnlər həkk olunmuşdur:

1. Məzarın yaxınlığında yerləşən hücrənin yuxarı mərtəbəsində həkk olunmuş kitabədə:

"Əgər dünya bir adamdan ötrü əbədi olsaydı, onda (ölməz) peyğəmbərlər üçün bu həmişəlik olardı. Çətin ki, bir adam ölümdən xilas ola, o zaman Məhəmmədin (ə.s.) silahdaşları ölümdən xilas olardılar".

2. Məzarın şərq tərəfindəki kitabədə:

"Ey siz inananlar, öz sədəqələrinizi məzəmmət və inciklik ilə boş şeyə puç etməyin. Bu yüksək, mübarək imarətin tikilməsi tarixi" [*19*, səh. 83].

3. Hücrənin aşağı mərtəbəsində həkk olunmuş kitabə isə belə yazılıb:

"Ey bu kitabəyə baxan, kitabənin və onun sahibinin bağışlanmasını Allahdan xahiş elə".

4. Şərq divarında həkk olunmuş kitabədə:

"Şeyx Cüneydin – Allah ona rəhmət eləsin – dəfn olunması tarixi və bu işıqlı mübarək binanın tikilməsi tarixi 951-ci ildir. Onu Əbdül-Qəni əl-Vəndami yazdı" [*19*, səh. 84].

Beləliklə Şeyx Cüneydin şəxsiyyəti, fəaliyyəti ilə bağlı verdiyimiz məlumat-lardan aşağıdakı nəticələr hasil olur:

– Şeyx Cüneyd Ərdəbil dərgahının Azərbaycan Səfəvi dövlətinə çevrilməsi yolunda bir dönüş nöqtəsi idi.

– Ərdəbil dərgahı məhz onun sayəsində yaranışından bəri sahib olduğu dini fəaliyyətində dəyişiklik edərək siyasi yola baş qoydu. Sultan titulu qəbul etməsi də buna əyani sübutdur.

– Bayanudurlularla qohumluq bağlarının qurulması isə bu titulun möhürü oldu.

– Bu cür bir sima üçün bina edilən və əsrlərdən bəri qorunaraq zamanımıza qədər gəlib çatmış bir türbənin nəinki mühafizə edilməsi, həm də daimi zi-yarət çevrilməsi labüddür.

İstər, Şeyx Cüneydin, istərsə də oğlu Şeyx Heydərin ilkin hədəf kimi Şirvanı seçmələri təsadüf deyildi. Onların məqsədi Azərbaycan torpaqlarını, o cümlədən də Şirvanı ehtiva edən vahid bir dövlət qurmaq idi. Sağlıqlarında bu istəklərinə nail ola bilməsələr də Şirvan torpağında dəfn edilmələr ilə əslində xələfləri Şah I İsmayılın və Şah I Təhmasibin gələcəkdə vahid bir Azərbaycan dövləti qurmalarına vəsilə ola bildilər.

**Ədəbiyyat**


1. *Bayramlı Z.H*. Azərbaycan Səfəvi dövlətinin quruluşu və idarə olunmasında türk qızılbaş əyanlarının rolu. Bakı: Avropa, 2015.
2. *Coşar Z*. Höbek kurultayından Safevi devletine Şah İsmail. İzmir: Sergi ya-yınevi, 2013.
3. *Çetinkaya N*. Kızılbaş türkler. Tarihi, oluşumu ve gelişimi. Ankara: Kripto, 2012.
4. *Əfəndiyev O.Ə*. Azərbaycan Səfəvilər dövləti. Bakı: Azərnəşr, 1993.
5. *Gündüz T*. Son Kızılbaş Şah İsmail. İstanbul: Yeditepe yayınevi, 2014.
6. *Hinz W*. Uzun Hasan ve Şeyh Cüneyd (çeviren: T.Bıyıklıoğlu). Ankara: Türk Tarih Kurumu Basımevi, 1992.
7. *Kaplan D*. Safeviler ve Kızılbaşlık. Aleviliğin tarihsel temelleri. Ankara: Gece kitaplığı, 2015.
8. *Kırzıoğlu F*. Osmanlılar'ın Kafkas-elleri'ni fethi (1451–1590). Ankara: Türk tarih Kurumu, 1998.
9. *Musalı N.S*. Ərdəbildən Aksaraya uzanan yol: Yusif Həqiqi Baba və Şeyx Cüneyd Səfəvi // Bakı Universitetinin Xəbərləri. Humanitar elmlər seriyası, 2012. № 1. S. 130–137.
10. *Musalı N.S*. I Şah İsmayılın hakimiyyəti ("Tarix-i aləmara-yi Şah İsmayıl" əsəri əsasında). Bakı: Elm və Təhsil, 2011.
11. *Nemət M.S*. Azərbaycanda pirlər. Bakı: Azərnəşr, 1992.
12. *Özdemir İ*. Aleviliğin yazılmayan tarihi. Kavramlar-Kaynaklar-On İki İmamlar. Tarih-Sürek-İnanç-İbadet-Edebiyat. Ankara: Kripto, 2014.
13. *Rasim Əfəndi*. Azərbaycan İncəsənəti. Bakı: Şərq-Qərb, 2007.
14. *Sümer F*. Safevî Devletinin kuruluşu ve gelişmesinde Anadolu Türklerinin rolü (Şah İsmail ile halefleri ve Anadolu Türkleri). Ankara: Türk Tarih Ku-rumu Basımevi, 1999.
15. Türkiye Diyanet Vakfı İslâm Ansiklopedisi 44 ciltte. 8-ci cilt. Cilve-Dârün-ned ve Ankara: TDV, 1993.
16. *Uçan M*. Kızılbaş ordusu. İstanbul: Kalender yayınevi, 2013.
17. *Бакиханов А.-К*. Гюлистан-и Ирам / ред., комментарии, приме. и указатели академика АН АзССР *З.М. Буниятова*. Баку: Элм, 1991.
18. *Бартольд В.В*. Сочинения. Т. II. Ч. I. Москва: Изд-во восточной лит-ры, 1963.
19. *Неймат М.С*. Корпус эпиграфических памятников Азербайджана. Т. IV. Арабо-персо-тюркоязычные надписи Куба-Хачмазской зоны и Южного Дагестана (VIII–начало XX вв.). Баку: Нурлан, 2008.
20. *Петрушевский И.П*. Ислам в Иране в VII–XV веках (курс лекций). Ленинград: Изд-во Ленинградского ун-та, 1966.
21. *Фазлуллах ибн Рузбихан Хунджи*. Тарих-и алам-ара-йи Амини / пер. с перси. на англ., с англ. на русс., введ., прил. и комм. *В.Ф. Минорского*. Баку: Элм, 1987.

## SUMMARY

**E.R. NAJIYEV**

## THE HISTORY OF THE 555-YEAR-OLD GRAVE

***Keywords:*** *Safavid's, Ardabil, Sheikh Junayd, Hazra, trustee.*

The article is about one of the heads of the Safavid religious order, Sheikh Junayd, who differed from the former sheikhs with his political views. The study not only analyses the history of the Mausoleum of Sheikh Junayd, which is located in the village of Hazra over his grave, but also gives information about the personality and activities of the Sheikh.



## РЕЗЮМЕ

**Э.Р. НАДЖИЕВ**

## История 555-летней могилы

***Ключевые слова:*** *Сефевиды, Ардебиль, Шейх Джунейд, Хазра, мутавалли.*

В статье рассказывается об одном из глав Сефевидского религиозного ордена – шейхе Джунейде, который отличался от бывших шейхов своими политическими взглядами. В ходе исследования были проанализированы не только история мавзолея шейха Джунейда, расположенного в селе Хазра над его могилой, но дана и информация о личности и деятельности шейха.